AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 114-126
https://dx.doi.org/10.48445/u1378-6309-4170-d

XALQ YARADICILIĞI

# Türk dillərində həftə adları

***Nərgiz Hacıyeva***
Filologiya elmləri doktoru, dosent. AMEA Nəsimi adına Dilçilik İnstitutu. Azərbaycan.
E-mail: haciyeva.nergiz.1961@mail.ru
https://orcid.org/0000-0003-4298-0097

**XÜLASƏ**
Məqalədə həftə günlərinin tarixən bir çox dünya dillərində eyni şəkildə adlandırılmasından, fonosemantika məsələlərindən bəhs olunur. Azərbaycan xalqının tarixi keçmişini, etnoqrafiyasını tədqiq etmək baxımından zaman leksikasını əks etdirən həftə günlərinin adları mühüm əhəmiyyət kəsb edir. Türk dillərində xalq tərəfindən vaxtilə həftənin günlərinə verilən adlar fars-ərəb dili və İslam dininin təsirilə sıxışdırılaraq aradan çıxmış, Azərbaycan dilində ərəb-fars sözləri üstünlük təşkil etmişdir. Dünyanın bir sıra dillərinin qohumluğu, vahid dil ailəsinin mövcudluğu məsələsinin həllində həftə günlərinin bu dillərdə tarixən eyni adlarla adlanması yalnız etnoqraf, tarixçilərin deyil, eyni zamanda dilçilərin də üzərinə düşən vəzifələrdən biri hesab edilir. Bu isə tarixi mənbələrin dərindən araşdırılması ilə üzə çıxarıla bilər. Həftə günlərinin tarixən bu dillərdə kosmik ulduzlarla, planetlərlə əlaqəsi də maraq doğuran məsələlərdən biridir. Dialektlərdə həftə günlərinin qədim adları müxtəlif mənalarda qorunub saxlanılmışdır. Türk dillərində həftə günlərinin adları müxtəlif şəkildə – xalqın təsərrüfat tərzinə uyğun olaraq adlandırılır.

**AÇAR SÖZLƏR**
həftə adı, etimologiya, alınma söz, planet adı, fonosemantika

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 09.07.2021
qəbul edilib: 16.07.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 114-126
https://dx.doi.org/10.48445/u1378-6309-4170-d

**FOLKLORE**

# The names of the week in Turkish languages

***Nargiz Hajiyeva***
Doctor of Philological Sciences, Associate Professor. Institute of Linguistics named after Nasimi of ANAS. Azerbaijan.
E-mail: haciyeva.nergiz.1961@mail.ru
https://orcid.org/0000-0003-4298-0097

**ABSTRACT**
The article discusses the problems of phonosemantics and that the days of the week historically are called in the same way in most world languages. The names of the days of the week, which reflect the lexicon of time, are important in terms of studying the history, past and ethnography of the Azerbaijani people. The names given to the days of the week by the people in the Turkish languages were suppressed and disappeared under the influence of the Persian Arabic language and religion, and the Arabic-Persian words prevailed in the Azerbaijani language. The investigation of the kinship of a number of languages of the world, the existence of a single language family, the historical naming of the days of the week in these languages with the same names is one of the tasks of not only ethnographers and historians, but also linguists. In dialects, the ancient names of the days of the week are preserved in different meanings. In Turkish languages, the names of the days of the week are used with different names and are named according to the economic style of the people.

**KEYWORDS**
the name of the week, etymology, borrowing, the name of the planet, phonosemantics

**ARTICLE HISTORY**
Received: 09.07.2021
Accepted: 16.07.2021

## Giriş / Introduction

Türk dillərində və eləcə də Azərbaycan dilində zaman anlayışı bildirən sözlər barədə bir sıra tədqiqat əsərləri yazılmışdır. Bu əsərlərdə ayrı-ayrı türk dillərində ay, həftə, il adları müxtəlif mövqelərdən təhlil olunur, dialektlərdə xalqın onlara verdiyi adların etimologiyası açıqlanır, bu adların planetlərlə, ulduzlarla əlaqəsi izah edilir. Bir çox qədim ərəb mənbələrində aləmin yeddi gün ərzində yaradılması ilə əlaqədar həftənin də yeddi gündən ibarət olması fikri irəli sürülür.

Bəzi tədqiqatçılar tarixən türk dillərində həftə adlarının olmamasını və ya müxtəlif təsərrüfat məsələləri ilə əlaqədar xalqın müəyyən günlərə fərqli adlar vermənisini göstərirlər. Ədəbiyyatşünas alim M.Adilov "Həftənin günləri və ədəbi dil norması" adlı məqaləsində həftə günlərinin sıralanmasının müsəlman və xristianlarda müxtəlif olduğunu yazır. Müsəlmanlarda həftənin ilk günü şənbə hesab olunursa, xristianlarda (Rusiyada) bazar ertəsi hesab edilir. İlk baxışdan adi hal kimi qəbul edilən bu ikililiyin tarixən xalqımızın təfəkkürünə, onun adət-ənənələrinə, düşüncə və yaşayış tərzinə güclü təsiri olmuşdur. Əvvəllər xalqımızın təsərrüfat tərzi ilə əlaqələndirdiyi gün adları çox-çox sonralar yazılı fars dili və ədəbiyyatı təbliğatı ilə sıxışdırılıb aradan çıxarılmış, gün adları farslaşdırılmışdır. Daha sonra ərəb dili və dini bu adlara nüfuz etmişdir [1, s.200].

"Divanü-Lüğat-it-Türk" əsərində M.Kaşğari qeyd edirdi ki, "Türklərdə həftənin yeddi gününün adı yoxdur, çünki həftə anlayışı islamiyyətdən sonra meydana çıxmışdır. Ayların adına gəlincə, şəhərlərdə ay adları ərəbcə işlənir. Köçərilər və müsəlman olmayan türklər ili dörd fəslə bölərək ad verirlər. Hər üç ayın bir adı var, ilin keçməsi bununla bilinir. Novruzdan sonra yaza "oğlaq ay", sonra "uluq oğlaq ay" deyirlər. Çünki bu ikinci zaman parçasında oğlaq böyüyür. Bundan sonra "uluğ ay" gəlir, çünki bu dövr yay ortasıdır, yer üzündə nemətlər artır, heyvanlar böyüyür, süd çoxalır. Digər aylar da bu şəkildə davam edir, az işləndiyi üçün bunların adını tək-tək saymıram" [10, s.356].

Rusiyalı şərqşünas-alim A.N.Samoyloviç müxtəlif türk xalqlarında həftənin həm ümumi, həm də xüsusi adlarının işlənməsini qədim dövrdə kənardan alınma sözlərlə əlaqədar olduğunu və ya etnik türklərin türk olmayan xalqlarla qaynayıb-qarışması nəticəsində meydana çıxdığını yazır [28, s.98].

Lakin qeyd etmək lazımdır ki, keçmiş zamanlardan qədim türklərin əcdadı olan Şumer-Assur mədəniyyətində kosmik planetlərin, ulduzların adlarına uyğun olaraq, həftənin günlərinə müəyyən adlar verilmiş, onlar planet adları ilə adlandırılmışdır. Tarixən Azərbaycan xalqı müxtəlif dildə danışan xalqlarla daim iqtisadi-siyasi,

mədəni əlaqələrə malik olmuş və bu əlaqələr öz əksini həmin xalqların dilində əks edilmişdir. Bu əlaqələrin hələ eramızdan əvvəlki dövrlərə qədər gedib çıxmasını bir sıra tarixi mənbələr və əldə olunan yazılı abidələr də sübut edir. Öz köklərini Babil-Assur mədəniyyətindən də əvvələ aparıb çıxaran həmin mənbələrdə müəyyən zaman dövründə bu xalqların vahid dil və mədəniyyətə malik olduğu öz əksini tapır. A.N.Samoyloviç Sibir və Orta Asiya sərhədlərindən kənarda yaşayan müsəlman, xristian, yəhudi və ya şamanist olmasından asılı olmayaraq, türk xalqlarının və türk dilində danışan xalqların müsəlman həftə günlərinin iranlaşmış və ya ərəb adlarından istifadə etməməsinə aid bir sıra maraqlı faktlar olduğunu göstərir. Bu uzaqlaşmalar bəzən dəqiq izah olunmadan Ön Asiya, Qafqaz və Şərqi Avropa ərazisində bir sıra etnoloji və mədəni-tarixi məsələlərin işıqlandırılması üçün zəngin material verir [28, s.100].

Qədim insanlar müxtəlif tanrılara, ilahi varlıqlara sitayiş edərək həftənin günlərini ilahi varlıqlarla, tanrılarla, kosmik aləmlə əlaqələndirməyə çalışmışlar. Yazılı abidələrdən olan V-VII əsr qədim uyğur abidəsi "Xuastuanift" (Chuastuanit, as bussgeet der Manichäer, hrsg, und übers von W.Radloff. St.Petersbuq: Buchdruckerei der Kaiserlichen Akademie der Wissenchaften, 1909, 51 p.) əsərinin hər bölməsində dini məlumat və qanunlar yer alır. Bu qayda-qanunların tapdanması ilə nəticələnən günahlar sıralanaraq, bunlardan xilas olmaq və bağışlanmaq üçün yalvarışlar edilir: ...On üçüncü: – *Ay tanrı günü* boyu tanrıya, təmiz, saf dindarlara günahlarımızdan azad olmaq üçün yalvarmaq gərək idi [13, s.19-20]. Bu gün "Ay tanrısı günü", daha doğrusu, bazar ertəsi hesab olunurdu [28, s.98-119].

Qeyd etmək lazımdır ki, Ay və Gün tanrısı və onlara xas günlər qədim türklərə, azərbaycanlılara da məxsus olmuşdur. Soqdi-manixey planetar həftəsi bazar günündən başlayaraq (Günəş günü) adlanır [29, s.98].

Yazıçı Y.V.Çəmənzəminlinin "Qızlar bulağı" əsərində qədim Babil mədəniyyətində ay, günəş tanrısı, ulduzların da adlarına və onlara məxsus xüsusiyyətlərə rast gəlmək olur. Məs: Halını bildirdikdən sonra qoca dedi: – Sin (Ay allahı) onun yuxusuna girib dedi [8, s.373]; Utarid altında doğuldunuz, yenə o ulduzun himayəsindəsiniz [8, s.356].

Qədim təsəvvürlərin izləri dialektlərdə də özünü qoruyub saxlamışdır. M.Adilov yazır: "Bəzi dialektlərdə bazar ertəsi (I gün) "duz günü", bazar (VII gün) "süd günü", çərşənbə axşamı (II gün) "qəm günü" hesab olunur" [1, s.205]. Bizim fikrimizcə, akademik N.Y.Marr doğru olaraq göstərirdi ki, süd günü və duz günü əslində Günəş və Ay ilə əlaqədardır [25, s.102]. İndi də "süd kimi aydın", "süd kimi təmiz" ifadələri işlədilir.

Həftənin günlərinin adı bir çox Avropa dillərində də (ingilis, fransız, italyan və ispan dillərində) ay adları kimi qədim dövrlərdə sitayiş olunan tanrıların adları ilə əlaqəli imiş. Bir çox xalqların dilində həftə adlarında bu qədim, ilahi təsəvvürlər yoxa çıxdığı halda, Avropa xalqlarının dilində özünü qoruyub saxlaya bilmişdir.

İngilislərin həftə günlərinin adları onların sitayiş etdikləri qədim tanrıların şərəfinə adlandırılmışdır. Monday – (Bazar ertəsi) Moon day – Ay tanrısı; Tuesday – (Çərşənbə axşamı) – Tyura – təkqollu şücaət tanrısı; Wednesday – (Çərşənbə) – Vednes; Thursday – Vednes tanrısının ən şücaətli və böyük oğlu olan Tur adlı tanrı; Friday – (Cümə) – Friqa və ya Freya adlı sevgi və savaş tanrısı; Saturday – (Şənbə) – Saturn tanrısı; Sunday – (Bazar günü) – Sun adlı gün tanrısı.[5]

Birinci gün – Monday (Ay günü); İkinci gün – Tuesday (Mars günü); Üçüncü gün – Wednesday (Merkuri günü); Dördüncü gün – Thursday (Yupiter günü); Beşinci gün – Friday (Venera günü); Altıncı gün – Saturday – (Saturn günü); Bazar günü – Sunday (Günəş günü).[6]

Göründüyü kimi, ayrı-ayrı dil ailələrinə mənsub olsalar da, bu xalqların həftə günlərini qədim allahların adı ilə adekvat adlandırması onların nə zamansa yaxın dil birliyinə malik olduğunu sübut edir. Müxtəlif xalqlarda həftə günlərinin eyni adlanması insanlığın ilkin dövrləri ilə əlaqədardır. İnsanlığın etnik dövrü ərzində allahların və ilahələrin artıq müəyyən olunan qohumluğuna yalnız tarixəqədərki, lakin insanlığın kosmik dövrü nəzərə alınmadan baxsaq, bu, daha çox anlaşılmazlığa səbəb olar. Akademik N.Y.Marr bir çox xalqların dilində İştar adının müxtəlif fonetik dəyişikliklərlə eyni mənada – od, günəş, göy, yağış, su, hava, ulduz, ay mənası verdiyini və onların sevgi ilahəsi və müharibə allahı mənasında işləndiyini qeyd edir [25, s.109-179]. İştar adının müxtəlif fonetik dəyişmələrlə dünyanın bir çox dillərində işlənməsini tədqiq edən N.Y.Marr, bunun təkcə assur və ya digər semit dilində, habelə şumer dilində də öz paleontologiyasına mənsub olmadığını qeyd edir. Bu, yazıyaqədərki, bizə məlum olan yazılı Mesopotamiya dillərindən biri və ya ikisidir ki, öz izini yalnız dildə deyil, həm də Mesopotamiya yazılarında saxlamışdır. Onlar bizi Assur-Babil mədəniyyətindən əsrlərcə uzağa, on min illər əvvələ aparır ki, hələ o zaman nə semitlər, nə də Hind-Avropa xalqları yox idi. Onlar bizi fikirləşməyə vadar edir ki, Assur-Babil mədəniyyətinin etnoqrafik, ictimai əsasları haradan qaynaqlanır. Müəllif Venera, Saturn, Yupiter, Uran və s. ulduz adlarının və Azərbaycan adının (Atarpatakan) İştar sözündən yarandığını göstərir [25, s.174].

Qədim Babil-Assur mənbələrini tədqiq edən Y.V.Çəmənzəminli “Qızlar bulağı”

[5] https://www.bildirchin/az>ingilis-dilindeki-hefte-günleri
[6] https://melumatlar.az>blog>heftenin-günleri

əsərində bunları qeyd etmişdir: "Bir gün axşamçağı geyinib, *İstər* məbədinin (Eşq ilahəsi. Sürəyya ulduzuna müqabildir) yanına getdi [8, s.372].

Həftənin günlərinin müəyyən ulduz, planet adları ilə əlaqəsini N.Gəncəvinin "Yeddi gözəl" əsərində də görmək olur. Poemada Bəhram-Gur üçün dünyanın hər tərəfindən gətirilmiş gözəllərdən ötrü tikilən yeddi saraydan söhbət açılır. Saraylar o vaxtın astroloji anlayışına görə hər birinin öz rəngi olan və hərəsi həftənin konkret bir gününü təcəssüm etdirən yeddi planetə həsr olunmuşdur: 1) Yaşıl saray – Ay – Bazar ertəsi; 2) Qırmızı saray – Mars – Mərrix – Çərşənbə axşamı; 3) Mavi (göy) saray – Merkuri – Ütarid – Çərşənbə; 4) Səndəl rəngində olan saray –Yupiter – Müştəri (Cümə axşamı); 5) Ağ saray – Venera (Zöhrə) – Cümə; 6) Qara saray – Saturn (Zühəl) – Şənbə; 7) Sarı saray – Günəş – Bazar günü" [15, s.168-177].

Həftənin günlərindən, xüsusilə ikinci günün demək olar ki, bir çox xalqlarda Mars müharibə tanrısı və planetinin təsiri ilə qəm günü, boş gün, sayılı gün, xas gün adlanması bu xalqların nə zamansa vahid dil birliyinə mənsub olduğunu bir daha sübut edir. A.N.Samoyloviç yazır: "Həftə günlərinin adlarında bəzən yüksək dərəcədə gözəl, yerli xüsusiyyətlər bizə imkan vermir ki, bu yerlərin coğrafi əhatəsində adların vahid sistemini müəyyənləşdirək, lakin digər tərəfdən qeyd etmək lazımdır ki, hər şeydən əvvəl daha çox ikinci günün adlanmasında Şərqi Avropa, Qafqaz, Ön Asiya və Balkan yarımadasında yaşayan türklərin dilində, habelə Şərqi Avropanın bəzi fin xalqlarında uyğunluqlar özünü göstərir" [28, s.103].

Alim daha sonra yazır: "Görünür, Zaqafqaziyanın mərkəzində sadalanan türk və türk olmayan xalqlarda ikinci günə xüsusi adlar verilməsi müsəlman dininə qədərki inamlarla əlaqədardır ki, nə türk, nə də finlərdə olmamışdır. İkinci günün xüsusi adlarının Şərqi Avropadan Zaqafqaziya vasitəsilə Ön Asiyaya yayılması bizim tərəfimizdən müəyyən olunmayan mədəniyyətin geniş əhatəsidir ki, bu, Qafqazdan əvvəlki çox uzaq bir dövrü, müəyyən olunmayan bir dövrü ifadə edir" [28, s.105]. Ayrı-ayrı dinlərə xas insanlar arasında həftə günlərinin eyni adlanmasını A.N.Samoyloviç Xəzər şahlığı dövrü ilə əlaqələndirir, daha doğrusu, bizim eranın VIII-XI əsrlərinə aid edir. Lakin fikrimizcə, bunun izləri Babil-Assur mədəniyyətindən də əvvəlki dövrə gedib çıxır. Bu səbəbdən həmin mənbələrin daha çox etimoloji-tarixi izaha və tədqiqata ehtiyacı var.

Fonosemantikanın əsaslarını tədqiq edən rusiyalı yazıçı S.Voronin dünyanın 150-dən çox dilinin təqlidi sözlərində fonosemantika və fonetik simvolizm məsələlərini tədqiq etmişdir [Воронин С. Москва, 2006]. O, bir çox dünya dillərinin təqlidi sözlərinə səslə məna arasında əlaqəni tədqiq etmiş, bu dillər arasında oxşarlıqları müəyyən etməyə çalışmışdır. Lakin qeyd etmək lazımdır ki, fonoseman-

tika məsələləri nəinki ilkin təqlidi sözlərdə, həm də həftə günlərinin adlarında da özünü qoruyub saxlamışdır. Belə ki, bu adlar bir çox xalqlarda müxtəlif fonetik dəyişmələrlə eyni mənada işlənir və xüsusi əhəmiyyət kəsb edir. Bu da nə zamansa vahid bir dilin olduğunu bir daha sübut edir.

Ulduzların xüsusiyyətləri türk tədqiqatçılarından biri B.Ögelin "Türk mitolojisi" əsərində geniş şəkildə izah olunmuşdur [17, s.204-216]. Buradan aydın olur ki, ulduzlara xas xüsusiyyətləri bütün xalqlar eyni dərəcədə qəbul etmiş və onları həftə adlarında tədqiq etmişlər. Belə ki, bir çox xalqlarda ikinci günün ulduzu olan Mars planeti müharibə allahı kimi qəbul olunur. "Qamusi-türki" lüğətinin müəllifi Ş.Sami göstərir ki, ikinci gün "müharibə allahı" Mars planeti ilə əlaqədar olduğu üçün bədbəxt günlərdən hesab olunur [Sami Ş. Tebriz, 2008]. Mars (Mərrix) planetinin aid olduğu ikinci gün bu planetin öz xüsusiyyəti ilə əlaqələndirilir. Məs.: Sübh günəşinin qızartısı göyə səpilərkən Mərrix məbədinə getdim; Mərrixin tələb etdiyi ilk qan təslim edildi [8, s.428].

Müsəlman olmayan çuvaş xalqında N.İ.Aşmarinin göstərdiyi kimi, ikinci gün mənasında "ıtlarni kun, ıtlari kun", "artıq cümə günü" (daha doğrusu, artıq bayram) hesab olunur [20, s.92-112]. Türk xalqlarından olan mişarlar ikinci günü "buş kön" – azad, boş gün adlandırırlar. Avstriya şairi M.Qartmana görə, Suriya türkmənləri bu günü "tadil" (tətil, boş vaxt) [28, s.103], azərbaycanlılar "xas gün" – xüsusi gün, Osmanlı türkləri, qaqauzlar, krım tatarları, noqaylar ikinci günü "Salı, Sali" adlandırırlar. Ayrı-ayrı lüğətlərdə Salı, sayılı gün, xüsusi gün hesab olunur. Sasani şahlarında ikinci gün hərbi oyunların və müqəddəs odların yandırıldığı gündür [23, s.196-197]. "Salı gününün ingiliscəsi olan Tuesday Skandinav zəfər və savaş tanrısı Tyr-un adından verilmişdir. Bu, Romanın zəfər tanrısı Marsla əlaqələndirilmişdir. Fransızca Salı günü "Margu", ispanca "Martes", italyanca isə "Mattegur" adlanır. Salı sözü ərəb dilindəki "səllasə" və "fars-suryanicə" üçüncü gün mənası verən "seşənbə" sözündən götürülmüşdür. Yunanlar bu günü Konstantinopol alındığı üçün şanssız hesab edirlər. Yəhudilərdə isə əksinə, bu gün şanslı gün hesab olunur. Həzrət Əli Hüreyrə görə, Allah Salı günü məkruhu yaratdı. Sami Ramazanoğlu həzrətlərinin Yunus surəsi təfsirinə görə isə Salı günü qan günüdür, çünki o gün Həvva heyz gətirdi. Adəmin oğlu qardaşını o gün öldürdü. Əski türk inamlarına görə, Salı günü bir işə başlanılmaz".[7] Salı – həftənin ikinci günü, çərşənbə axşamı, tək günü adlanır [5, s.28]. Həftənin ikinci günü mənasında "xas günü" də işlənir. Ş.Saminin "Qamusi-türki" lüğətində salı – məhdud, nadir, adlı, məşhur, sayqılı, mədəni deməkdir [18,

[7] onedio.com >cafe>heftenin günleri

s.28].

Rusiyalı şərqşünas-alim V.V.Radlovun lüğətində 1. saylı – hazır, yerinə yetirilmiş; 2. yaxşı yerinə yetirilmiş deməkdir [27, s.119].

Xas – həftənin ikinci günü, çərşənbə axşamı, tək günü adlanır [4, s.429]. Ağbaba, Gədəbəy, Xanlar, Qax, Qazax, Mingəçevir, Şəki, Tovuz dialektlərində – çərşənbə axşamı; Xas – Gədəbəy, Tovuz – bazar günü adlanır [6, s.216]. Bir sıra dialektlərdə həftənin günləri belə verilir: Azat günü – bazar günü [2, s.34]; baca-baca günü – Novruzun ilk günü, 21 mart; xas günü – həftənin II günü [6, s.116].

Azərbaycanın ayrı-ayrı dialektlərində indi də həftənin günlərinin adı xalq dilinə uyğun şəkildə müxtəlif adlarla işlənir. Azərbaycan dilində həftə günlərinin Bakı quberniyasında orijinal adlarından bazar, bazar ertəsi və çərşənbə axşamının “süd günü”, “duz günü” və “bənümə günü” kimi işləndiyini qeyd edən A.N.Samoyloviç, digər günlərin çərşənbə, cümə axşamı, cümə, şənbə olduğunu yazır [28, s.102]. Dialektlərdə həftənin günləri müxtəlif orijinal adlara malikdir. “Peyğəmbər” leksemi eyni fonetik quruluşda Azərbaycan dilinin bəzi dialektlərində “qarğıdalı” (Quba, Laçın), bəzi dialektlərində isə “bazar ertəsi” (Göyçay) mənasını ifadə edir [14, s.15]. Bənümə/bənimə (Bakı), bənəmiyyə (Şahbuz). Müxtəlif fonetik variantlarda olan bu söz bazar ertəsi mənasını verir. Bənəmiyə (Ordubad, Şahbuz) – bazar ertəsi; Bənimə – Bakı [6, s.51].

Türk dillərində həftənin adları müxtəlif adlarla işlənsə də, onların mənasında eynilik özünü göstərir. Çuvaşlarda beşinci gün “ernə kün” adlanır. Bəziləri bu sözü hərfi tərcümə edərək “həftənin günü” adlandırırlar [22, s.31]. N.İ.Aşmarinə görə bu fikir səhvdir, dəqiq tərcümədə bu gün beşinci gün (tatarca atna, başqırdca azna) adlanır [20, s.92-112]. Ad(ı)na – cümə axşamı, həftənin dördüncü günü [3, s.48]. Gəncə, Qazax, Salyan, Lənkəran, Gədəbəy, Şəmkir, Tovuz, Zəngilan – cümə axşamı; Gədəbəy, Tovuz – cümə; Adına ertəsi – şənbə (Tovuz) [6, s.12].

Dialektlərdə həftə günlərinin belə adlanmasına baxmayaraq, İslam dinini qəbul etdikdən sonra bu adlar unudulmuş, lakin bir çox dialektlərdə ərəb-fars sözləri ilə yanaşı paralel şəkildə işlənməyə başlamışdır. Həftə adlarının xalq dilinə, dialektlərə uyğun işlənməsini təklif edənlər də olmuşdur.

Tarixən və müasir dövrdə də həftənin müəyyən günlərinin adları təsərrüfat işləri ilə əlaqədar dəyişdirilərək, həmin işə uyğun şəkildə adlandırılıb. Qədim mənbələri tədqiq edən tarixçilər yazır: “Tarixən Bərdə şəhərinin Bab-əl-Əkrad adlanan qapısı yanında bir kvadrat fərsəx böyüklüyündə “Əl-Kurkiy” adlı bazar var, bazar günləri camaat bura yığışır... Əl-Kurkiy həmişə eyni yerdə açıldığına görə həftənin həmin gününün adına üstün gəlmişdir. Hətta bir çoxları həftənin günlərini sayarkən deyirlər:

şənbə, Əl-Kurkiy, bazar ertəsi, çərşənbə axşamı və s. və beləliklə, həftənin günlərini sayırlar" [7, s.103-105]. Bazar qurulan yerdə satılan malın adıyla bağlı gün adları:

1. Cüz – Bazar ertəsi. "Cüz" – ərəb dilində hissə, qrup mənasını verən "cüz" sözündəndir. "Bez, parça bazarı" kimi adlandırılan bu bazar yerləri Anadolunun bir çox yerlərində gün adı kimi işlənməkdədir;
2. Egirme – Çərşənbə. "Egirme günü" əyrilmiş yun ipliklərin satıldığı bazar yeri;
3. Erek – Bazar ertəsi. Heyvan satılan gün mənasında işlənir;
4. İşıklı – Çərşənbə. Bu söz Anadoluda əl dəzgahında toxunma bez mənasında işlənir. Konyada işlənən "cüz bazarı" adına mənaca uyğun gəldiyi üçün bu parçanın satıldığı bazarın qurulduğu yerə "İşıqlı bazarı" və "İşıqlı" adı verilmişdir;
5. Palamut günü – Bazar ertəsi. Həmin günlərdə bölgədə yetişən palıdın satıldığı gün;
6. Tabak bazarı – Çərşənbə. Dəri və dəri məmulatlarının satıldığı gün [İsmixanova G. Bakı, 2015].

Xalqın etiqadına görə, Novruz bayramının həftənin hansı gününə düşməsindən asılı olaraq, həmin ilin də elə keçəcəyi ehtimal olunur. Hər il Novruz bayramının həftənin ayrı-ayrı günlərinə düşməsinin mənasını açıqlayan rusiyalı şərqşünas-alim N.N.Pantusov yazır ki, əgər müəyyən ildə Novruz bayramı bazar gününə düşərsə, xalq sevinc içində olar, sülh və şənlik olar. Birinci günə düşərsə, xalqlar, dövlətlər arasında çoxlu düşmənçilik yaranar, lakin müharibə olmaz. İl ildırım kimi tez keçər. Bayram ikinci günə düşərsə, çoxlu qanqaralıq, dövlətlər arasında mübahisələr baş verər, xalq əzab çəkər. Üçüncü günə düşərsə, aclıq olar, oğurluq artar. Lakin tacirlərin işi yaxşı gedər. Dördüncü günə düşərsə, xalq sevinc içində olar. Beşinci gün çoxlu toy, şənlik olar. Altıncı günə düşərsə, aclıq olar, müharibə, mübahisə çox olar [Пантусов Н. Казань, 1901].

Çuvaşlarda birinci gün – "tunda qon" – yeni doğulmuş gün, ikinci gün – "ıtlarnı qon" həftədə artıq gün, üçüncü gün – "yon qon" – qan günü adlanır və s. "Kalım kon" – bütpərəst bayramıdır. O, rusiyalı dilçi N.İ.Zolotnitskinin lüğətində qeyd edildiyi kimi, üçüncü və şənbə günləri Pasxa bayramı ərəfəsində axırıncı həftədə yerinə yetirilir [22, s.31]. Rusiyalı yazıçı V.A.Sboyev yazır ki, "Qeyd etməyi lazım bilirəm ki, əvvəl pasxal ehsanları üçüncü gün (kalım kon), Pasxa bayramı ərəfəsində axırıncı həftədə yerinə yetirilirdi və bununla bütpərəst çuvaşlarda Böyük Allaha qurbanlar kəsilir, sonra evlərdən və kəndlərdən pis ruhların, şeytanların qovulma mərasimi başlayırdı. Bu birliyi sözün özü ifadə edirdi: "kalım kon" (gəlin üçün verilən başlıq). Lakin zaman keçdikcə "kalım kon", Pasxa bayramı ərəfəsində axırıncı həftənin üçüncü günü yalnız ölüləri yad etmək üçün işlənməyə başladı, Böyük Allaha qurban

kəsmə və pis ruhları qovma altıncı günə keçirildi" [29, s.114].

Rusiyalı etnoqraf V.Maqnitskiy "kalım" sözünü başlıq sözü kimi deyil, tatar dilində olan "qan" sözü ilə əlaqələndirir. "Kanım" və ya "kalım" – mənim qanımın günü. Həmin gün çuvaşlarda "yon qon" – qan günü hesab olunur [24, s.103-105].

Karaçay-Balkar dillərinə, Şimali Qafqaz xristian dini V əsrdə Taman yarımadasından Bizans dövləti vasitəsilə keçmişdir. Buna görə bir çox həftə günlərinin adı xristianlıqla əlaqədar yaranmışdır: ikinci gün "Qeyurqe kyun" (Müqəddəs Georgi günü), üçüncü gün "Baraz kyun" (Müqəddəs Paraskev günü), beşinci gün "Bayram kyun" (Müqəddəs Məryəm günü), altıncı gün "Şabat kyun" (yəhudi dinindən). Birinci gün "baş kyun", dördüncü gün "orta kyun", altıncı gün "ıyıx kyun" adlanır. I və II günlər qadağan olunmuş günlərdəndir. Onun əsasında qədim xristian-bütpərəst sistemi durur. "Şabat" sözü bir çox Qafqaz xalqlarında (gürcülərdə "şabat", çeçenlərdə "şot", çərkəzlərdə "şembet") qədim yəhudi sözü "sabat"dan (bayram, rahatlıq) götürülmüşdür [30, s.99-106].

Karaimlərdə gün, ay, həftə, il və s. adları özünəməxsusdur: yek kün (bazar günü), yex – baş gün (bazar ertəsi), şebbat (şənbə günü), xan gün (xain gün, orta gün), ayna gün, baras gün (dördüncü gün), bayram gün (beşinci gün) [11, s.8].

İudaizmə aid dini ad və terminlərin əksəriyyəti xristianlıqda da vardır. Yəni bunlar iudaizm inancı ilə yanaşı, xristian dini mətnlərdə də öz əksini tapır. Ancaq həftə günlərinin adları arasında "şənbə günü" mənasında farsca "şambe" sözünün qarşısında sırf yəhudilərin inancı ilə bağlı ibranicə "*şabbat"* kökündən olan "şabat" sözü işlənmişdir: "şabat kün" – latınca qarşılığı "şabato" – yəhudilərin istirahət günü, şənbə [12, s.20]. Amerikalı tarixçi P.Qolden bu sözü Xəzər dilinin ünsürü hesab etmişdir [19, s.50].

Göründüyü kimi, ayrı-ayrı türk dillərində bazar, dördüncü və beşinci günlər uğurlu günlərdən hesab olunur. Şənbə günü demək olar ki, bütün türk dillərində eyni səs tərkibi ilə işlənir və istirahət günü mənasında başa düşülür. Türk dillərində həftə adlarının müxtəlif fonetik dəyişikliklərlə işlənməsi hər bir dilin fonetik sistemi ilə əlaqədardır. Qeyd edək ki, türk dillərində həftə günlərinin hamısının mənasını bir məqalədə tam şəkildə açmaq mümkün deyil. Biz onların yalnız bəzilərini göstərməklə kifayətləndik.

Müasir dövrdə həftə adlarının uşaqların yaddaşında daha yaxşı saxlanılması məqsədilə yazıçılar bir sıra orijinal vasitələrdən istifadə edirlər. Şair İ.Tapdıq "Günlərin adı" adlı uşaq şeirində Bünyad adlı oğlanın dilindən günlərə belə ad verir: bazar ertəsi – Günbir, çərşənbə axşamı – Güniki, çərşənbə – Günüç, cümə axşamı – Gündörd, cümə – Günbeş, şənbə – Günaltı [16, s.16].

**Nəticə / Conclusion**

Nəticə olaraq onu qeyd etmək lazımdır ki, türk dillərində həftə günlərinin adının İslam dini və fars-ərəb dili vasitəsilə yarandığını söyləyən dilçilər az olmamışdır. Lakin qədim zamanlardan, Babil-Assur mədəniyyətindən, qədim türklərin etiqad və inamından doğan təsəvvürlərdən aydın olur ki, həftə günlərinə müəyyən tanrılara inamla əlaqədar adlar verilmişdir. Bu adlar bir çox Avropa dillərinin həftə günləri adlarında indiyədək işlənməkdədir. Həftə günlərinin müəyyən ulduz və planetlərin xüsusiyyətləri ilə bağlı məlumatlar bir çox mənbələrdə qorunub saxlanmışdır. Müxtəlif dünya dillərində özünü adekvat şəkildə göstərən bu adların tədqiqi onların nə zamansa vahid bir dil ailəsinə mənsub olduğunu sübut edir. Bu da fonosemantika və fonetik simvolizm məsələlərinin izah olunmasında əvəzsiz mənbələrdən biridir. Təbii ki, bu məsələlərin həlli qədim mənbələrin dərindən araşdırılması, tarixi məxəzlərin dəqiq tədqiqi ilə özünü daha da doğrulda bilər. Bu adların bir çox dünya dillərində qarşılıqlı məna və səs xüsusiyyətlərinə malik olmasını aşkara çıxarmaq bir sıra xalqlar arasında əlaqələrin daha da möhkəmlənməsinə, multikulturalizm məsələlərinin genişlənməsinə vüsət verər.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Adilov M. (2020). Əsərləri, X cild. Bakı, Elm və təhsil. 456 s.
2. Ağbaba şivəsi sözlüyü. (2014). Sumqayıt, AM-965 MMC-nin mətbəəsi. 280 s.
3. Azərbaycan dilinin dialektoloji lüğəti. (2007). Bakı, Şərq-Qərb. 568 s.
4. Azərbaycan dilinin izahlı lüğəti, I cild. (2006). Bakı, Şərq-Qərb. 744 s.
5. Azərbaycan dilinin izahlı lüğəti, II cild. (2006). Bakı, Şərq-Qərb. 792 s.
6. Azərbaycan dilinin izahlı lüğəti, IV cild. (2006). Bakı, Şərq-Qərb. 712 s.
7. Azərbaycan tarixi üzrə qaynaqlar. (2007). Bakı, Çıraq. 400 s.
8. Çəmənzəminli Y.V. (2005). Əsərləri, II cild. Bakı, Avrasiya Press. 664 s.
9. İsmixanova G. (2015). Oğuz qrupu türk dillərində zaman anlayışı bildirən sözlər. Nam.diss., Bakı, 28 s.
10. Kaşğari M. (2006). Divanü Lüğat-it-Türk I. Bakı, Ozan, s.356.
11. Kazımov İ. (2016). Karaimlər və onların dili. I Türkoloji qurultayın 90 illiyinə həsr olunmuş konfransın materialları, 14-15 noyabr. Elm və təhsil, s.5-9.
12. Quliyev İ. (2012). “Codex Cumanicus”un leksikası. Bakı, 32 s.
13. Quliyeva Q. (2015). “Xuastuanift”in dili (“Manixeylərin tövbə duası”). Nam.diss., 145 s.

14. Məmmədova S. (2016). Oğuz türklərinin mənəvi mədəniyyət leksikası. Nam.diss., 32 s.
15. Sadıqova S. (2012). Nizami Gəncəvi yaradıcılığında elmi dilin inkişafı. Nizami Gəncəvi – 870. Məqalələr toplusu. Bakı, Elm və təhsil, s.168-177.
16. Tapdıq İ. (1982). Qoçaq dovşan. Bakı, Gənclik. 144 s.
17. Ögel B. (1995). Türk mitolojisi II. Ankara, Türk Tarih Kurumu Basım Evi. 314 s.
18. Sami Ş. (2008). Qamusi-türki. Tebriz, 945 s.
19. Golden P.B. (1992). Codex Cumanicus. Sentral Asian Monuments, p.50.
20. Ашмарин Н.И. (1905). Об одном мусульманском могильном камне на архиерейской дачи в Казани. Известия общество археологии, истории и этнографии. При императорском Казанском Университете, т.XXI, №1, с.92-112.
21. Воронин С.В. (2006). Основы фоносемантики. М., ЛЕНАНД. 248 с.
22. Золотницкий Н.И. (1875). Корневой чувашско-русский словарь. Сравненный с языками и наречиями разных народов тюркского, финского и других племен. Казань, 279 с.
23. Иностранцев К.А. (2014). Материалы из арабских источников для культурной истории сасанидской Персии. Москва, Директ-медиа. 218 с.
24. Магнитский В. (1881). Материалы к объяснению старой чувашской веры. Типография Императорского Университета, Казань. 275 с.
25. Марр Н.Я. (1927). Иштарь (от богини матриархальной Афреврази до героини любви феодальной Европы). Яфетический сборник, Изд-во Академии Наук, с.109-179.
26. Пантусов Н.Н. (1901). Материалы к изучению наречия таранчей илийского круго. №3, Казань, Типо литография Императорского Университета. 37 с.
27. Радлов. В.В. (1911). Опыт словаря тюркских наречий. СПб, Т.4, 1227 с.
28. Самойлович А.Н. (1923). Названия дней недели у турецких народов. Яфетический сборник II, Петроград, с.98.
29. Сбоев В.А. (1856). Исследования об инородцах Казанской губернии, Казань, Дубровин. 188 с.
30. Улаков М.З., Махиева Л.Х. (2019). Некоторые вопросы религиозной терминологии (на материале современного карачаево-балкарского языка). Известия Кабардино-балкарского научного центра РАН №3 (89), с.99-106.
31. https://www.bildirchin/az>ingilis-dilindeki-hefte-günleri

